**UOT: 338.33:334.012**

# MİKROMALİYYƏLƏŞDİRMƏ YOLU İLƏ AZƏRBAYCANDA SAHİBKARLIĞIN İNKİŞAF PERSPEKTİVLƏRİ

**T.S. QASIMLI**
**Bakı Mühəndislik Universiteti**

*Mikromaliyyələşmə ölkədəki kiçik və orta miqyaslı sahibkarlıq subyektlərinin borclanmaya olan tələbəinin ödənilməsi baxımından olduqca vacibdir. Belə ki, əksər ölkələrdə bu miqyaslı sahibkarlıq daxili istehlak məhsullarını təmin etmək üçün əsas mənbədir. Onların maliyyələşməsi təmin olunmazsa, istehlakçıların tələbinin ödənilməsində problemlər müşahidə edilə bilər. Bu tədqiqatda məhz Azərbaycanda mikromaliyyələşmənin və bu tip maliyyələşməni tələb edən kiçik və orta sahibkarlığın vəziyyətini araşdırılmışdır. Nəticədə mikromaliyyələşmənin qarşısında dayanan problemlər 3 səviyyədə (sahibkarlıq subyektləri səviyyəsində, maliyyə institutları səviyyəsində və makroiqtisadi səviyyədə) izah edilmişdir. Sonda isə müvafiq həll yolları irəli sürülmüşdür.*

***Açar sözlər:*** *kiçik və orta müəssisələr, mikromaliyyələşdirmə, kredit, sahibkarlıq, kredit zəmanət fondu/*

Maliyyəyə əlçatanlıq istənilən bir şirkətin bazar dəyişkənliyinə reaksia vermək və davamlı inkişaf etmək imkanlarını şərtləndirən əsas amillərdən biridir. Bu baxımdan mikromaliyyələşmənin səviyyəsi və inklusivliyi isə ölkədəki kiçik və orta sahibkarlığın (KOM) inkişafı və çevikliyi üçün əvəz edilməz faktora çevrilir. Bu tədqiqatın əsas məqsədi məhz Azərbaycanda mikromaliyyələşmənin səviyyəsini müəyyən etmək, onun inkişafına maneə törədən problemləri aşkar etmək və mümkün həll yolları təklif etməkdir.

**Sahibkarlıq anlayışı və sahibkarlıq subyektlərinin miqyasına görə təsnifatı**

Mülkiyyət anlayışının yarandığı dövrdən bəri cəmiyyət öz ehtiyaclarını ödəmək üçün məyyən fəaliyyət sahələrini istər dövlət istərsə özəl sektorun əlində işkişaf etdirməyə başlamışdır. Bu prosesin “məhsulu” olaraq, sahibkarlıq anlayışı da formalaşmış və öz yerini tapmışdır. Bu anlayış adı altında sözü gedən ehtiyacları müəyyən qarşılıq əvəzində ödəməyə çalışan bir qrup formalaşmışdır ki, onlara da sahibkarlar deyilir. Bu kategoriyanın məşğul olduğu iş əsasən, tələbin müəyyənləşdirilərək onu ödəyəcək təklifin yəni məhsul və xidmətlərin yaradılmasıdır.

Bazar təsərrüfatının mühüm aparıcı qüvvəsi hesab edilən sahibkarlıq fəaliyyəti iqtisad elminin əsas tədqiqat obyektlərindən biridir. Sahibkarlığın qərarlaşması orta əsrlərə təsadüf etmişdir. Kapitalizmin yaranması ilə sahibkarlıq daha da inkişaf etməyə başlamış və hazırda özünün yüksək bir mərhələsinə gəlib çatmışdır. Bir çox elmlərin öyrənmə obyekti kimi sahibkarlığın bir çox şərhləri və tərifləri çoxluğu əmələ gəlmişdir.

Beynəlxlaq təcrübədə bu subyektləri miqyas baxımından ayıran vahid bir yanaşma yoxdur. İşçi sayı baxımından şirkətin kiçik və orta sahibkarlıq subyekti (KOM) hesab edilməsi üçün olan meyar 250-500 arasında dəyişir. Şikətin illik dövriyyəsi baxımından isə meyarın maksimum həddi 21.5 mln. dollarla – 100 mln dollar intervalındadır. Azərbaycanda isə bir şirkətin KOM hesab edilməsi üçün işçilərinin sayı 125, şirkətin illik dövriyyəsi isə 1.2 mln. manatdan az olmalıdır.

**Mikromaliyyələşmə ilə kiçik və orta sahibkarlıq arasındakı əlaqə**

Mikromaliyyə dedikdə - yeni fəaliyyətə başlayan və inkişaf üçün ənənəvi bank maliyyəsinə yol tapmaqda çətinlik çəkən mikro həcmli və xırda sahibkarların maliyyələşdirilməsi başa düşülür. Hətta bunu bəzi mənbələrdə “ilkin maliyyə yardımı” adlandırırlar. Bu mikromaliyyələşmənin klassik izahından fərqli yanaşmadır. Klassik izahda ona baza - təməl maliyyələşdirmə kimi tərif verirlər yəni, qısa müddətə yuxarı faizlə yeni başlayan müəssisələrə və ya dövriyyə vəsaiti üçün verilən az miqdarda pul.

Mikromaliyyə sistemi KOM-ların iqtisadi cəhətdən asılılıqlarından xilas edib onları məhsuldar hala gətirərək nizamlı gəlir sahibi olmalarını təşviq edib, digər tərəfdən istehsal prosesinə qatılan yeni iş gücü sayəsində mövcud istehsal potensialını və dolayı yolla istehsal səviyyəsini artırır. Bunun təbii nəticəsi olaraq da böyümə, inkişad və tərəqqi kimi makro iqtisadi hədəflərin həyata keçməsinə kömək edir

Mikroiqtisadi fəaliyyətlə məşğul olan biznes sahiblərinin və bu sahədə fəaliyyətə yenicə başlayanların maliyyə tələbatları bank sektoru tərəfindən kifayət qədər təmin olunmadıqda, bunların maliyyə xidmətlərilə təmin olunmasının əsas yolu mikromaliyyələşdirmə proqramlarıdır.

KOM-lar üçün mikrokreditlər böyük əhəmiyyət daşımaqdadır. Bir az işçisi olan bu tip müəssisələrə, iqtisadiyyatın onurğasını təşkil edir demək daha düzgün olar. Uyğun hüquqi və iqtisadi mühitdə mikrokreditlə dəstəklənən KOM-lar inkişaf və rifah baxımından böyük dəstəklər verir.

**Azərbaycanda KOM-ların və onların mikromaliyyələşmənin vəziyyəti**

Azərbaycanda KOM-ların vəziyəti tədqiq olunan zaman isə onların 2015-ci il üzrə ÜDM-dəki payının 11.0% olduğu məyyən edilib. Beynəlxalq təcrübədə isə bu rəqəm 60% ətrafıənda dəyişir. Həmin il üçün KOM-larda çalışan muzdlu işçilərin ölkədəki muzdlu işçilərə nisbəti isə 5.9%-dir (Beynəlxalq təcrübədə bu rəqəm 40-70% arasında dəyişir). İxracdakı yerinə gəldikdə isə Azərbaycandakı KOM-ların cəmi 2%-I ixracda iştirak edir (digər ölkələrdə 30%-ə qədər çatır) və onların ixracının həcmi qeyri-neft ÜDM-nin cəmi 2.1%-ni təşkil edir(digər ölkələrdə 17%-ə qədər çatır).

Bu isə Azərbaycanda KOM-ların vəziyyətində əsaslı problemlərin olduğunu göstərir. Bu problemlərdən biri də məhz mikromaliyyələşmə ilə bağlıdır. Ümumilikdə Azərbaycanda kreditlərin əldə edilməsi prosesi dünya ölkələrinə nisbətədə həm çətin həm də uzundur. Belə ki, məhz bu səbəbdən Azərbaycan “Doing Business 2018” hesabatında kreditlərin əldə edilməsi indiqatoruna görə, 190 ölkə işərisində 122 pillədə dayanır.

**Sözügedən maliyyə problemlərinə yol açan səbəblər 3 aspektdə sıralanmışdır:**

- **KOM-ların fəaliyyətindən irəli gələn səbəblər** (KOM-ların fundamental quruluşunun onları riskli müştəri etməsi, KOM-ların alternativ maliyyə alətlərindən istifadə bacarığı zəif olması və ya ümumiyyətlə olmaması, KOM-ların əksər hissəsi kölgə iqtisadiyyatında fəaliyyət göstərməsi, normal fəaliyyət göstərən KOM-ların maliyyə hesabatlılığı aşağı səviyyədə olması, KOM-ların peşəkar düşüncə tərzinə sahib olmaması, onlarda maliyyə savadlılığı aşağı səviyyədə olması və KOM-ların girov imkanlarının zəif olması);
- **Maliyyə institutlarından irəli gələn səbəblər** (Klassik bankçılıq ənənəsinin davam etdirilməsi, kreditə müraciətin mürəkkəbliyi və standart müqavilə və prosedurların olmaması, bankların riskləri qiymətləndirə bilməməsi, məlumat çatışmazlığı, yaxşı və pis müştərini ayıra bilməməsi, KOM-lara qarşı yüksək girov tələbinin olması və KOM-lara verilən kreditlərin müddətinin qısa olması);
- **Makroiqtisadi vəziyyətdən irəli gələn səbəblər** (Fiskal genişlənmənin faiz dərəcələrini şişirtməsi, ölkə reytinqinin xaricdən cəlb edilən vəsaitlərə təsiri, ölkə iqtisadiyyatının neft qiymətlərindən aslılığı, devalvasiya şoklar, nağdsız hesablaşmaların aşağı səviyyəsi, ölkədə qiymətli kağızlar bazarının zəif inkişafı və cəmiyyətdə maliyyə savadlılığının aşağı olması).

**Mikromaliyyələşmədən irəli gələn porblemlərin həlli yolları**

Bu problemlərin aradan qaldırılması üçün isə həmin aspektlərə müvafiq olan həll yolları təklif edilir:

**Mikromaliyyələşmənin yüksəldilməsinin KOM-larla əlaqədar həll yolları:**

- KOM-ların digər vəsaitlərinin də girov kimi tanınma imkanlarının artırılması;
- KOM-lar üzərində vergi öhdəliklərinin icrası üzərində nəzarət tədbirlərinin artırılması;
- KOM-lara maliyyə hesabatı hazırlamaq üçün metodiki yardım göstərilməsi.
- KOM sahibkarlarına müasir menecment metodları və maliyyə savadlılığı ilə bağlı təlimlərin keçirilməsi

**Mikromaliyyələşmənin yüksəldilməsinin maliyyə institutları ilə əlaqədar həll yolları:**

- Yeni bank məhsullarının tətbiqi və banklarda KOM-ların faiz ödənişlərindən deyil, KOM-ların dövriyyəsindən qazanmaq imkanının yaradılması;
- Banklarda standart müqavilə sisteminin formalaşdırılmasının tətbiqi;
- Vahid müştəri qeydiyyat sisteminin tətbiqi;
- Qiymtləndirmə metodlarının müasirləşdirilməsi;
- Özəl kredit bürolarının tətbiqinin sürətləndirilməsi;
- Kredit Zəmanət Fondunun əhatəsinin genişləndirilməsi;
- Kreditlərin verilmə müddətinin uzadılması ilə bağlı banklara dəstək proqramının tətbiqi;
- Regional filialların açılmasının təşviqi;
- Qiymətli kağız bazarında “Bir Pəncərə” sistemnin tətbiqi.

**Mikromaliyyələşmənin yüksəldilməsinin makroiqtisadi vəziyyətlə əlaqədar həll yolları:**

- Mikromaliyyədə faizlərin aşağı endirilməsinin təmin edilməsi;
- Xaricdən vəsaitlərin cəlbi üçün mexanizmin formalaşdırılması;
- Milli valyutanın nisbi sabitliyinin təmin edilməsi;
- Nağdsız hesablaşdırmaların artırılması;
- Cəmiyyətdə maliyyə savadlılığının artırılması;
- Təminat zəncirini vəsaitlə təmin edən qeyri-bank qurumlarının yaradılması.

Tədqiqatın son nəticəsi olaraq, sözügedən tədbirlərin KOM-ların mikromaliyyələşməsindəki vəziyyəti sağlanlaşdırması və inkişafı bərpa etməsi baxımından yararlı ola biləcəyi hesab edilir.

## ƏDƏBİYYAT

**1.** “Doing Business 2018” hesabatı. **2.** Korkmaz, T., & Bayramoğlu, M. F. Yoksullukla Mücadele Mikrofınans Modeli ne Mikrofinans Kuruluşlarının Finansal İşlevleri 2008 (s 99-100). **3.** MET, Önder, “Küçük ve Orta Ölçekli İşletmelerin Finansal Sorunları: Kırgızistan’da Bir Araştırma”, Sosyoekonomi, T.C. Hacettepe Üniversitesi, Ankara 2011 (s 35). **4.** Q.N.Manafov. Sahibkarlıq fəaliyyətinin sosial-iqtisadi aspektləri, Bakı, 2000 (s 35). 5. www.ifc.org. 6. www.oecd.org. 7. www.stat.gov.az.

### Перспективы развития предпринимательства в Азербайджане через микрофинансирование

**Т.С. Гасимли**

Микрофинансирование очень важно для любой экономики, чтобы обеспечить финансовый спрос на малый и средний бизнес в стране. Поэтому в большинстве стран этот масштаб предпринимательства является основным поставщиком отечественных потребительских товаров. Если этот король финансового кризиса, клиенты столкнулись с проблемой нехватки отечественной продукции. В этом исследовании исследуется состояние микрофинансирования в Азербайджане и состояние малого и среднего бизнеса, требующих такого финансирования. В результате проблемы, связанные с микрофинансированием, были объяснены на трех уровнях (на уровне предпринимательства, финансовых институтов и макроэкономических уровней). В итоге были предложены соответствующие решения.

***Ключевые слова:*** малые и средние предприятия, микрофинансирование, кредит, предпринимательство, фонд гарантийных гарантий

### Development Perspectives of Entrepreneurship in Azerbaijan Through Microfinance

**T. S. Gasimli**

Microfinance is very important for any economy to provide finance demand of small and medium-sized businesses in the country. So in most countries, this scale of entrepreneurship is the main provider of domestic consumer products. If that king of finance failure, customers faced problem of scarcity of domestic products. In this study, the condition of microfinance in Azerbaijan and the condition of small and medium-sized businesses that require such financing are investigated. As a result, problems facing microfinance have been explained at three levels (at the level of entrepreneurship, financial institutions, and macroeconomic levels). In the end, the relevant solutions have been suggested.

***Key words:*** small and medium enterprises, microfinance, credit, entrepreneurship, credit guarantee fund.

e-mail - Turalqasimli@gmail.com

